© *“Metafizika” Journal*
*Vol 6, issue 3, serial 23, 2023. pp.10-29*
*p-ISSN 2616-6879*
*e-ISSN 2617-751X*

**UOT:** 94
**KBT:** 63.3 (0)5
**MJ №** 176

# Türkiyə Cümhuriyyətinin təsisində ərəb faktoru və çağdaş dövr

**Fərda Əsədov***
**Samid Bağırov****

**Abstrakt.** Türkiyənin ərəb dünyası ilə bağlı maraqları son yüz ildə üç dəfə ciddi dəyişikliyə məruz qalıb. Anadolu coğrafiyasında siyasi hakimiyyətin dəyişməsi maraqların müəyyən mənada dəyişməsinə, bəzən də ərəb coğrafiyası və dövlətləri məsələsinin prioritetlər sırasından çıxmasına və ya yenidən həmin cərgəyə geri gətirilməsinə səbəb olub. Osmanlı imperiyası dönəmində müsəlman coğrafiyasının vəziyyəti prioritet olaraq gündəmdə saxlanılsa da, Cümhuriyyət dönəmində gündəmdən çıxarılmış, lakin XXI əsrdə yenidən Türkiyənin xarici siyasətinin ayrılmaz hissəsinə çevrilmişdir.

**Açar sözlər:** Türkiyə Cümhuriyyəti, ərəb dünyası, Hatay problemi, Sykes-Piko anlaşması, Mustafa Kamal Atatürk, Ədalət və İnkişaf Partiyası

## 1.Giriş

Türkiyə-ərəb münasibətlərini birincinin baxışından araşdırmaq asan olduğu halda ikincinin baxışından araşdırılması bəs qədər çətindir. Bu, ərəb dünyasında uzun illər, hətta əsrlər boyu vahid siyasi sistemin və vahid strategiyanın olmaması ilə bağlıdır. Elə indinin özündə də ərəb dünyasında fərqli siyasi cəbhələr, onların Türkiyə ilə münasibətlərinin də fərqliliyinə səbəb olub. Bu səbəbdən Türkiyə-ərəb münasibətlərinin araşdırılması dəqiqlik və xüsusi obyektlivlik tələb edir.

Mövzunun aktuallıq və əhəmiyyəti bir neçə səbəbdən irəli gəlir. Tərəflərin dünyanın təkcə regional deyil, qlobal müstəvidə, xüsusilə də enerji və tranzit məsələlərində əhəmiyyətli mövqeyə malik olması mövzunun daha əhəmiyyətli və aktual olmasından xəbər verir.

* Tarix üzrə fəlsəfə doktoru,
AMEA akademik Z.Bünyadov adına Şərqşünaslıq İnstitutunun baş elmi işçisi və “Ərəb ölkələrinin tarixi və iqtisadiyyatı” şöbəsinin müdiri; Bakı, Azərbaycan
E-mail: asadovfm@hotmail.com
https://orcid.org/0000-0002-9034-0011
** AMEA akademik Z.Bünyadov adına Şərqşünaslıq İnstitutunun elmi işçisi; Bakı, Azərbaycan (məsul müəllif)
E-mail: sami80@mail.ru

**Məqaləyə istinad:** Əsədov, F., & Bağırov, S. [2023] Türkiyə Cümhuriyyətinin təsisində ərəb faktoru və çağdaş dövr. *“Metafizika” jurnalı, 6*(3), səh.10-29.

**Məqalənin tarixçəsi:**
*Məqalə redaksiyaya daxil olmuşdur: 13.05.2023*
*Təkrar işlənməyə göndərilmişdir: 16.06.2023*
*Çapa qəbul edilmişdir: 01.09.2023*

Belə ki, fərqli müharibələr fonunda Qərbin və Çinin enerjiyə ehtiyacı artır. Həmçinin bu müharibələr fonunda dünyada qida təhlükəsizliyi ilə bağlı ciddi narahatlıqlar meydana çıxır. Türkiyə və ərəb dövlətləri isə bu ehtiyacı, yəni enerji və tranzit ehtiyacını ödəyən ən əsas ölkələr sırasındadırlar. Görünən də budur ki, son zamanlarda bir sıra ərəb dövlətləri dünya enerjisininin, Türkiyə də enerji və qida tranzitinin əsas təminatçılarına çevrilib və bu müstəvidə əməkdaşlıqlarını da artırırlar. Bir sıra ərəb dövlətlərinin Türkiyədə böyük yatırımları, Türkiyənin bəzi ərəb dövlətlərində ciddi siyasi və hərbi mövcudluğu regional vəziyyətə də öz təsirini göstərməkdədir.

Türkiyənin ərəb dövlətləri ilə bağlı siyasəti bəzən dini nüfuzla bağlı olub ki, bu da zaman etibarilə bəzən qabarıq şəkildə görünüb, bəzən də zəifləyib.

Qarşımızdakı yazı Türkiyə Cümhuriyyətinin təsisi dönəmini və sonrakı zamanı ehtiva etdiyi üçün yalnız son yüz ilin prosesləri araşdırılacaq və məsələlər zaman ardıcıllığı ilə bəhs ediləcək. Türkiyə-ərəb münasibətləri əks etdirilməklə yanaşı, bu əlaqələrin səbəb və amilləri də tədqiq ediləcək. Mövzunun aktuallığı nəzərə alınaraq, tərəflər arasında müasir dövr münasibətlər xüsusi şəkildə araşdırılacaq.

**2.Osmanlı-ərəb münasibətləri**

Türkiyə-ərəb münasibətlərinin ən aktiv dövrü Osmanlı imperiyası zamanına təsadüf edir. Bu münasibətlər Məmlukilərin sonuncu sultanlarından olan Kansu Gavrinin (1440-1516) Misirdə Osmanlılar tərəfindən 1517-ci ildə məğlub edilməsi və Hicazın nəzarətə götürülməsindən sonra yeni mərhələyə qədəm qoyub. Ərəb müsəlman dünyası bu dönəmdə yeni siyasi-ictimai reallıqlarla üz-üzə idi. Ərəb müsəlman dünyası bundan öncə də mühüm tarixi mərhələlərdə siyasi rəhbərlik mövsuzunda ideoloji böhranla üzləşmişdi. Raşidin xəlifələri dövründə siyasi rəhbərliklə bağlı meydana çıxan məsələlər, Əməvilər dövründə ciddi qarşıdurmalarla nəticələnsə də, haşimilərdən olan Abbasilər dönəmində müəyyən mənada gündəmdən düşmüşdü. Zaman etibarilə həmin ideloji-siyasi məsələlər sanki yaddaşlardan gedir, müsəlman dünyasına əcəm və qeyri-ərəblərin rəhbərliyi kimi məsələləri adi hala çevirmişdi. Artıq bu dövrdə Hicazda Qureyş və haşimilərdən olan ərəblərin rəhbərliyinin zərurəti gündəmə gətirilmirdi. Osmanlıların Hicazı nəzarətə götürməsini işğal adlandıran və buna qarşılıq verən cərəyanlar əsasən də XVIII əsrin sonlarında, xüsusilə də Napoleon Bonapartın bölgəyə hücumundan (1798) və Britaniya müstəmləkəçiliyindən sonra baş qaldırdı. Müasir ərəb yazıçılarından Məaz Sirac “Türkpress” saytında dərc etdiyi araşdırmasında, Osmanlıların ərəb dünyasına nəzarətini, ərəb olmayan Məmlukilər sultanı Kansu Gavrunun məğlub edilməsilə təmin etdiklərini yazaraq, bu məsələdə işğal faktorunu rədd edir. [Əl-Sirac, türkpreess, 12.03.2018].

XVII əsrdə ərəb torpaqları Osmanlıların nəzarətindəki ərazilərin beşdə ikisini təşkil edirdi. Onlar İraq və Əlcəzair istisna olmaqla digər 11 "ərəb əyalətləri"ni üç əsr boyu davamlı nəzarətə saxlaya bildilər. Ərəb coğrafıyasının ən şərqində yerləşən Yəməndən, qərbində yerləşən Əlcəzairə qədər əraziyə nəzarət edirdilər. Təbii ki, bu ərazilərin ən əhəmiyyətlisi xüsusi status verdikləri və Məkkə Şərifinin idarəçiliyində tanıdıqları Hicaz bölgəsi idi. Fatimilər, Əyyubilər, Məmlukilər kimi Osmanlılar da Məkkə və Mədinə hərəmlərinin idarəçiliyini Məkkə Şərifinin idarəçiliyinə vermiş, bölgənin portuqalıyalılar kimi xarici və qeyri müsəlman qüvvələrindən qorunması və təhlükəsizliyini öhdələrinə götürmüşdülər. Fransa və Britaniya işğalının və müstəmləkəçiliyinin ayaq açması ilə bölgədə Osmanlılara qarşı yerli qüvvələrin üsyanları müxtəlif formatlarda baş qaldırdı. Bu üsyanların ən əhəmiyyətlisi tarixdə "Osmanlı-Səudiyyə savaşları" kimi yadda qalıb ki, 1811-1818-ci illər ərzində azı 12 döyüşü özündə ehtiva edib. Təbii ki, bu savaşlara rəvac verən əsas amillərdən biri də həmin dövrdə Ərəbistan yarımadasında ərəblərin hakimiyyətini və "sələfi-salehin yolunu" bərpa etməyə çalışan "Sələfilik" və "Vəhhabilik" cərəyanı idi. Belə ki, hələ 1744-cü ildə Dəriyyə əmirliyinin 16-cı əmiri Məhəmməd bin Səudla (ölüm tarixi: 1818) görüşən Məhəmməd ibni Əbdülvəhhab (1703-1991) onun titulunu dəyişdirərək, "İmam" adı verir və "vəhhabi" cərəyanı ilə Səud ailəsinin hakimiyyəti arasında tarixi "Misaq əl-Dəriyyə" adlı anlaşmaya imza atılır [2. 10.07.2009]. Daha sonra Britaniya müstəmləkəçiliyinin bu üsyana dəstəyi də Osmanlı-ərəb münasibətlərinə kölgə salan digər amil olaraq tarixə düşür.

Britaniya və Fransa hücumlarının arması ilə Osmanlıların ərəb dünyasına baxışı və bölgənin idarəçiliyi ilə bağlı siyasəti bir qədər dəyişməyə başladı. Tikintisi XIX əsrin sonunda başlayan və XX əsrin əvvəlində bitən 1300 km uzunluğunda olan Hicaz dəmir yolu qatarı istifadəyə verildi. Dəməşqi Müqəddəs Mədinə şəhərinə birləşdirən bu dəmir yolu həcc mərasimi və ticarət tranzit yollarını asanlaşdırmaqla yanaşı bölgəyə hərbi qüvvələrin göndərilməsini də asanlaşdırırdı.

Məkkə Şərifi Hüseyn ibni Əli əl-Haşiminin (1853-1931) XX əsrin əvvəlində Osmanlı imperiyasına qarşı başlatdığı üsyanın səbəblərindən biri də ərəb xilafətinin bərpası idi. Onun ilk mərhələdə özünü "hicazın əmiri", daha sonra "ərəblərin kralı", daha sonra isə "müsəlmanların xəlifəsi" adlandırması da qarşıdurmanın həm də ideoloji müstəvidə davam etdiyini göstərirdi.

XX əsrin əvvəlində Britaniya, Fransa və Çar Rusiyasının Osmanlı ərazilərinə davamlı hücumları, Osmanlı dövlətinin borclarının kəskin artması, habelə Birinci Dünya müharibəsinin nəticələri regionda yeni şərtləri diktə edirdi. Osmanlı dövlətinin bu vəziyyətindən istifadə edib dünyanın müxtəlif

bölgələrindəki yəhudilərin Fələstinə köçürülməsi də məqsədyönlü və sistemli şəkildə həyata keçirilirdi. Sionizmin qurucularından olan Teodor Herzlin (1860-1904) yəhudilərin Fələstinə köçürülüməsi ilə bağlı çoxsaylı təklifləri və bu zəmində Avropa dövlətləri və ABŞ-ın davamıl təzyiqləri Sultan II Əbdülhəmidin (1842-1918) tərəfindən rədd edilirdi [Əl-Səllabi, Al-Jazeera, 23.05.2021]. Baxmayaraq ki, bu təkliflər əsasən Osmanlı dövlətinin xarici borclarının ödənilməsi qarşılığında edilirdi.

**3.Türkiyə Cümhuriyyətinin təsisində ərəb faktoru**

Osmanlı dövlət adamları ərəb coğrafiyasında verilən çoxsaylı itkilərdən xəbərdar idilər. Bu itkilər ərəb və İslam dünyasının nəzarətdən çıxmaması, Britaniya, Fransa Rusiya, Portuqaliya və s. qüvvələrin işğalına keçməsin deyə aparılan mübarizədə get - getdə artırdı. İtkilər həm canlı qüvvələr alır, həm də böyük maddi resursların sərf edilməsini tələb edirdi. Osmanlı dövlətinin və tərəfdarlarının Dəriyyə əmirliyi (Birinci Səudiyyə dövləti) ilə savaşda (1811-1818) 37 min canlı itki verməsi, Birinci Dünya müharibəsi dönəminə təsadüf edən Ərəb üsyanı dövründə 15 min ölü verməsi və 22 min əsirin düşməsi ciddi canlı itkilərin olmasından xəbər verir. Təbii ki, gələcək cümhuriyyətin idarəçilyində yer alacaq Osmanlı generalları bu itkiləri, sərf edilən resusrları görür fərqli qənaətə gəlirdilər [Atatürk Research Centre Journal, 2010, №78].

Bir tərəfdən Qara dəniz, Balkan, Aralıq dənizi, Qafqaz və sair bölgələrdə Çar Rusiyası və müttəfiqlərlə qarşıdurmada olan Osmanlı dövləti digər tərəfdən də Ərəb üsyanı və onlara dəstək verən Fransa və Britaniya müstəmləkəçiliyi ilə üz-üzə idi. 1916-cı ildən bəri ərəb üsyançılarına qarşı mübarizə aparan Osmanlı İmperiyası, 1918-ci ildə imzaladığı Mudros müqaviləsinə əsasən bölgədən çəkilməli oldu. Ərəb üsyanından sonra Britaniya Şərif Hüseynə türkləri bölgədən qovsun deyə vəd etdiyi torpaqları da vermədi. 1917-ci ildə imzalanmış Balfur Bəyannaməsinə əsasən Fələstində bir yəhudi məskəni də yaradıldı. Beləcə ərəb üsyanının nəticələri bu günə qədər bir çox problemlərə səbəb oldu. Həmin problemlər ki, Osmanlı və Türkiyə Cümhuriyyəti o problemlərlə yaxından çarpışmalı, bəzən yanaşı olmalı, bəzən də uzaq durmalı oldu.

Növbəti dövrdə ərsəyə gələn Türkiyə Cümhuriyyətinin xarici siyasətinin, xüsusilə də ərəb dünyası ilə bağlı siyasətinin formalaşmasında əvəzsiz rolu olan Mustafa Kamal Atatürk (1880-1938) Osmanlı dövlətinin son illərindəki prosesləri yaxından görürdü. Atatürk bu hadisələri nəinki yaxından görür, xüsisilə də Osmanlının ərəb dünyasındakı hərb siyasətinin əsas aparcılarından idi. Atatürk bu dönəmdə ərəb dünyasında ordu qüvvələrinə rəhbərlik etmiş, bir neçə dəfə ciddi yaralanmışdı. Bəlkə də onun quracağı cümhuriyyətin ərəb coğrafiyası və İslamla bağlı siyasəti də elə bu yaralar və məşəqqətlərdən təsir almışdı.

Onun Liviyaya ordunun yüksək rütbəli zabiti kimi yollanması Osmanlı ordusundakı mühüm mövqeyindən xəbər verirdi. İlk ezamiyyət Tripoliyə idi. Belə ki, 1911-ci ildə italyanlar Osmanlı İmperiyasının Şimali Afrikadakı son ərazisi olan Tripoli və Benqazini ələ keçirmək üçün müharibə elan etdilər. İtalyan qüvvələri heç bir danışıqlar aparmadan 4 oktyabr 1911-ci ildə Tripoliyə hücum etdi. Osmanlılar başlayan Trablus müharibəsində çətin vəziyyətdə idi. Müdafiə naziri olaraq vəzifəsini davam etdirən Mahmud Şövkət Paşa, Hərbi Akademiyada zabitlərlə keçirdiyi görüşdə quru qoşunları və donanmanın zəifliyi səbəbindən Tripolinin müdafiə oluna bilmədiyini etiraf etdi. Mustafa Kamal bu zaman İstanbulda Baş Qərargahda yüksək vəzifəyə təyin edilmişdi. O, bu vəzifəyə başlamazdan əvvəl Tripoliyə yola düşəcəkdi. Mustafa Kamal İstanbulu tərk etməzdən əvvəl İttihad və Tərəqqi Mərkəzi Komitəsindən maliyyə istədi və ona Ənvər Paşaya qatılacağı deyiləndə və haqqı ödənilmədikdə, imzaladığı hesablarla 200 lirə toplayıb Tripoli istiqamətində yola düşdü.

İtalyan qüvvələri bir ay ərzində Tripolidən Benqaziyə qədər olan sahilləri işğal etdilər. Osmanlı qüvvələri hücum gözlənilmədiyi üçün bundan öncə qüvvələrini Yəmənə göndərmiş və buna görə də italyanlara qarşı müdafiəsiz qalmışdılar. Həmin ərazidə cəmi 4000 əsgər var idi. Kamal Paşa və briqadası Qahirə və İsgəndəriyyə yolu ilə Benqaziyə getmək niyyətində idi. Mustafa Kamal Paşa oktyabrın 29-da İsgəndəriyyədən ayrıldıqdan az sonra yaralandı və iki həftə İsgəndəriyyədə xəstəxanada yatmalı oldu. Noyabrın 29-da İsgəndəriyyədən qatarla ayrılıb, dekabrın 1-də çatdıqları son stansiyadan ayrılaraq 8 günlük yoldan sonra Liviya sərhəddinə, dekabrın 12-də isə sərhəddən 80 km qərbdə yerləşən Dəfna bölgəsinə çatdılar. Mustafa Kamal ilk dəfə dekabrın 22-də Tobruq yaxınlığında italyanlarla döyüşdü. İtalyanlar oktyabrın 4-də Tobruqu ələ keçirdilər, lakin Tobruq bölgəsində, eləcə də bütün sahil zolağında Osmanlı qoşunlarının və ərəb tayfalarının partizan müharibəsi səbəbindən ölkənin daxili ərazilərinə doğru irəliləyə bilmədilər. Türk zabitləri arasında koordinasiya və mütəşəkkillik və İtaliya ordusunun hərbi texniki baxımdan tam inkişaf edə bilməməsi və geridə qalması onların daxili ərazilərə qədər irəliləyə bilməməsinin səbəbi kimi göstərilir. Buna baxmayaraq, italyanlar Osmanlıları məcbur etmək üçün "Oniki Adaları"na da hücum etdilər. Əvvəlcə Mustafa Kamal şərq birliyinə, Ənvər Paşa isə qərbə komandanlıq etdi. Əməliyyatın həcmi artdıqda Ənvər Paşa bütün cəbhəyə, Mustafa Kamal isə Dərnə bölgəsinə komandanlıq etməyə başladı. Atatürk 16-17 yanvar 1912-ci ildə Dərnə hücumu zamanı gözündən yaralanmış və bir ay xəstəxanada müalicə olunmuş və martın 6-da Dərnə komandanlığına gətirilmişdir. Lakin gözünün yenidən xəstələnməsinə görə, bir həftə yataqdan qalxa bilmədi.

Üç mart 1912-ci ildə Dərnə döyüşündə Osmanlı qüvvələri 63 ölü və 168 yaralı, italyanlar isə 200-ə yaxın ölü verdi. Bu vaxt Mustafa Kamal bütün Dərnə xəttinə komandanlıq edirdi və onun tabeliyində səkkiz Osmanlı zabiti, 160 əsgər, bir qədər könüllü, bir artilleriya bölüyü, italyanlardan qənimət götürülmüş silahlar var idi. Ərəb əsgərlərini Sənusi təriqətinin nümayəndələri təmin edirdi, onların şeyxləri isə Osmanlı zabitlərinə tabe idi. Bu qüvvə 1911-ci ilin oktyabrından 1912-ci ilin sentyabrına qədər 15.000-16.000 italyan əsgərini Dərnədə saxlaya bildi.

Sahil zolağında ilişib qalan İtalyan qüvvələri Osmanlıları sülhə məcbur etmək üçün Şərqi Aralıq dənizi və Qırmızı dənizə hücumlar təşkil etmək qərarına gəldi. 1912 martda Beyruta, apreldə Çanaqqalaya, mayda Rodos və “Oniki adaları”na hücum etdilər.

Müharibə davam etdikcə, Mustafa Kamal 1912-ci ilin iyulunda iki əmr verdi ki, bu da müharibənin sonrakı dövrdə daha yaxşı öyrənilməsinə imkan verdi. Onun verdiyi əmrlərdən birincisi bütün zabitlərin hərbi qəzet oxumaq və dünyada baş verən hadisələrdən və Osmanlı ordusunun uğurlarından xəbərdar olmaqdan ibarət idi. İkinci əmr isə ondan ibarət idi ki, bütün zabitlər müharibədə yaşadıqlarını, o cümlədən tarixi, şərtləri, komandirin əmrləri, əməliyyatlar və nəticələr, əsgərlərin psixoloji vəziyyətini bir ay müddətində qələmə alsınlar. Bu yolla o, Qərb düşməninə qarşı müharibədə əldə etdiyi təcrübələri qələmə almağı hədəfləmişdi. Mustafa Kamal bu müharibədə partizan döyüşləri, müvəqqəti birliklərin idarə olunması, kəşfiyyat məlumatlarının toplanması və maddi-texniki təminat kimi hərbi təcrübə əldə etməklə yanaşı, ərəb qəbilə başçıları ilə danışıqlar və müzakirələr yolu ilə diplomatiya sahəsində də əhəmiyyətli təcrübə qazanmışdı.

Artıq Balkan müharibəsi səbəbiylə Osmanlı hökuməti italyanlarla sülhə razı oldu. Balkan müharibəsi Osmanlının paytaxtının yaxınlığında gedirdi. Bunun üçün minlərlə km uzaqda olan Liviya cəbhəsini qoruyub saxlamaq məsələsi getdikcə əhəmiyyətini itirirdi. Bu, Mustafa Kamal Atatürkün ərəb dünyasına baxışının dəyişməsinin səbəblərindən biri idi.

Onun Ərəb coğrafiyasına ezamiyyəti davam edirdi. Yeddi mart 1917-ci ildə qərargahı Diyarbəkirdə yerləşən İkinci Ordunun komandir müavini vəzifəsinə təyin olunduqdan sonra Hicaz Qüvvələrinin komandanlığına da təyin olunması istəndi. Lakin o, bunu qəbul etmədi və 5 iyul 1917-ci ildə “İldırım Ordu Qrupu”nun komandanlığında Yeddinci Ordu Komandanlığına təyin edildi [T.C.Genelkurmay, Türk İstiklâl Harbine Katılan Tümen ve Daha Üst Kademelerdeki Komutanların Biyografileri, s.1-17].

Mustafa Kamal Atatürk ərəb coğrafiyasında apardığı döyüş və əməliyyatlarda aldığı yaralardan bir müddət Avropada müalicələr almalı oldu. 1918-ci ildə Almaniyadan qayıdarkən sol böyrəyindəki iltihaba görə

uzun müddət xəstəxanada yatdı. O, 1918-ci ilin iyun və iyul aylarında Vyanada müalicə olundu.

Avqustda 7-ci Ordunun komandanı olaraq Fələstin Cəbhəsinə təyin edildi. O, avqustun 26-da Hələbə çatdı, sonra sentyabrın 1-də Nablusdakı qərargahına köçdü. Suriyada və döyüş xəttində apardığı araşdırmalardan sonra Ənvər Paşanın ona yanlış məlumatlar verdiyini və gücünün zəif olduğunu gördü. Sentyabrın 19-da Britaniya qüvvələri İldırım Ordu Qrupuna hücum edərək Megiddo döyüşünü başlatdı. Döyüş nəticəsində İldırım Ordu Qrupunu təşkil edən 8-ci Ordu tamamilə, 4-cü Ordu isə böyük ölçüdə sıradan çıxdı. Yalnız Mustafa Kamal Paşanın komandanlığı ilə 7-ci Ordu Şam və Hələbdən şimala çəkilərək Kilisin cənubundakı Müslümiyyədə müdafiə xətti təşkil etdi. Mustafa Kamalın rəhbərlik etdiyi ordu Britaniya ordusunun ərəb coğrafiyasından Anadoluya soxulmasının qarşısını alan əsas qüvvə idi. Atatürk ərəb coğrafiyasında Britaniya Ordusuna qarşı müqavimətinə görə fəxri adlara layiq görülmüşdü. Lakin düşmənin hücumu və Osmanlı ordusunun təchizatı da tükənirdi. Mustafa Kamal Paşa İstanbula teleqram göndərərək, İldırım Ordu Qrupunun döyüş qüvvəsinin olmadığını bildirdi və ondan atəşkəs istəməsini təklif etdi. Sentyabrın 27-də İngilis qüvvələri 7-ci Ordunun arxa cəbhəsini təhdid edəndə o, Dəməşqin cənubunda yerləşən Kisvaya geri çəkilməyi əmr etdi. Müqavimətə baxmayaraq, Dəməşq sentyabrın 30-da süqut etdi. Mustafa Kamal qüvvələrini Hələbə çəkərək müdafiə əmri aldı. Hələb burada küçə döyüşləri də daxil olmaqla uzun müdafiədən sonra oktyabrın 25-də süqut etdi. Mustafa Kamal qalan qüvvələrini Anadoluya geri çəkdi.

Məlumdur ki, Mustafa Kamal Atatürk ərəb coğrafiyasında mübarizə və müqavimətin bir neçə çətinliyini asanlıqla görürdü. Aralıq dənizi, Qara dəniz, Balkan, Qafqaz, bütün bunlar ərəb coğrafiyasındakı müharibələrlə müqayisədə Osmanlının mərkəzini daha çox təhdid edirdi. Məhz bu səbəbdən Mustafa Kamal Liviyadan sonra ərəb coğrafiyasındakı ezamiyyətlərə ara verib, Balkana getmişdi. Digər səbəblərdən biri də xristian dünyasından gələn təhdidlərin ərəb müsəlman cəbhəsindən gələn təhdidlərdən daha ciddi olması idi. Ərəb üsyanına səbəb olan amillərdən biri də ərəb millətçiliyi idi ki, bu da Osmanlını geri itələyirdi. Yeraltı təbii sərvətlərin istismarı və əhəmiyyəti hələ meydana çıxmadığı bir zamanda səhra bölgələrinin nəzarətdə saxlanılması da iqtisadi görünmürdü. Ərəb coğrafiyasındakı bölgələrin nəzarətdə saxlanılması əsasən dini nüfuz amilləri ilə bağlı idi ki, bu da zaman etibari ilə əhəmiyətini itirmişdi.

Cümhuriyyətin xarici siyasətində Mosul məsələsi, Türkiyə-Yunanıstan anlaşması, Türkiyənin "Millətlər İttifaqı"na daxil olması, Balkan anlaşması,

Montrö Boğazları Konvensiyası, Sədabad razılaşması və Suriya ilə bağlı olan Hatay razılaşması Atatürkün dövlətə rəhbərlik etdiyi dövrə təsadüf edib.

Mosul məsələsi Türkiyənin İraqla, Hatay razılaşması Türkiyənin Suriya ilə, Sədabad anlaşması isə Ankaranın İraq və İranla razılaşmasının əks etdirirdi.

Lozanna müqaviləsi zamanı Türkiyə-İraq sərhədi çəkilməmişdi. Mosul-Kərkük bölgəsində zəngin neft yataqlarının olması Britaniya başda olmaqla bir çox ölkələrin diqqətini çəkirdi. Zəngin neft yataqlarına malik bu bölgə Mudros barışıq müqaviləsi imzalanarkən Britaniya tərəfindən işğal edildi. I Dünya Müharibəsi başa çatdıqdan sonra İraq Britaniya mandatı altına alındı. Lozanna Sülh Müqaviləsi zamanı bu mövzuda heç bir nəticə əldə edilmədi və problemin Türkiyə ilə Britaniya arasında daha sonra həll olunacağına qərar verildi. 1924-cü ildə Millətlər İttifaqı Türkiyə-İraq sərhədini çəkərək Mosul bölgəsini İraq tərəfində tərk etdi. 1925-ci il fevralın 13-də Şeyx Səid üsyanı başladı. Aprelin 15-də tamamilə yatırılan üsyan ingilislərin xeyrinə oldu.

Ümumiyyətlə bu üsyanın baş verməsi Türkiyənin İraq siyasəti ilə bağlı mühüm mərhələ hesab edilir. Bu üsyandan sonra Mosul və Kərkükdə hərbi əməliyyat keçirmək ehtimalı ortadan qalxdı. Türkiyə 5 iyun 1926-cı ildə ingilislərlə imzalanmış Ankara müqaviləsinə uyğun olaraq bəzi məbləğlər müqabilində Millətlər İttifaqının müəyyən etdiyi limiti qəbul etdi.

Bu üsyanın çıxmasında Lozanna Sülh Konfransı zamanı, Britaniya ilə razılıq əldə edilməyən Mosul probleminin təsiri olduğunu göstərən bir sıra sənədlər vardır. Mustafa Kamal Atatürk hələ 1923-cu il, 14 yanvarda Eskişehirdə etdiyi çıxışda, Mosul-Kərkük probleminə toxunarkən bu problemə bağlı kürd dövləti probleminin olduğunu da bildirdi.

> *“Mosul-Kərkük qədər əhəmiyyətli olan ikinci bir mövzu kürd problemidir. İngilislər orada (Şimali İraqda) bir kürd dövləti qurmaq istəyirlər. Bunu edərlərsə bu düşüncə bizim sərhədlərimiz daxilində yaşayan kürdlərə də yayılar. Buna mane olmaq üçün sərhədi daha da cənuba çəkmək lazımdır”* [Eskişehir İzmir Konuşmaları, İst. 1993, sf.95].

Britaniya Baş Naziri Lloyd Corc, 19 may 1920-ci ildə, San-Remodakı konfransda deyirdi:

> “Kürdlərin arxalarında böyük bir dövlət olmadıqca varlıqlarını davam etdirə bilməzlər. Türk rəhbərliyinə vərdiş etmiş olan kürdlərə yeni bir rəhbəri qəbul etdirmək çətin olacaqdır... ingilis mənfəətlərini dağlıq hissələrində kürdlərin yaşadığı Mosul və içində olduğu Şimali İraq maraqlandırır. Mosulun bu bölgədən alınaraq yeni və müstəqil kürd dövlətinə verilə bilinəcəyi düşünülür. Lakin onu danışıq yolu ilə həll etmək çox çətindir” [Olcay, Sevr Anlaşmasına Doğru. Ankara, SBF Yay, s.121].

Türkiyənin XX əsrdə ərəb və müsəlman ölkələri ilə bağlı siyasətinin formalaşmasında Atatürkün şəxsi qənaətlərinin böyük təsiri var. Onun fikirlərini araşdıran professor Gülnihal Bozkurt yazır:

> "Atatürk xarici siyasətində realist lider kimi davranır. O, xarici əlaqələrdə dinamik və cəsarətlidir; lakin macəraçı deyil. Atatürk İslamçılıq və Turançılıq hərəkatlarının zərərli ölçülərinə qarşı Milli Paktın çəkdiyi sərhədlər daxilində qalmağı qəbul etdi" [Bozkurt, 2003, Erişim tarihi: 14 Aralık 2009].

Türkiyə Cümhuriyyətinin XX əsrdə ərəb siyasətinin formalaşmasında Atatürkün xələfi İsmet İnönünün fəaliyyəti də mühüm rola malik olub. Təbii ki, burada söhbət Osmanlı Ordusunun yüksək rütbəli zabitindən, 1910-cu ildə üsyanı yatırtmaq üçün Yəmənə ezam edilmiş şəxsdən söhbət gedir. O, 26 aprel 1912-ci ildə mayor rütbəsinə yüksəldi və Yəmən üzrə Ordu Qüvvələrinin Baş Komandanlığının Qərargah rəisi təyin edildi. Baxmayaraq ki, İzzət Paşanın Zeydilərin başçısı İmam Yəhya ilə üç aylıq danışıqlardan sonra sülh bağladı və müəyyən bir müddət üçün Yəməndə nailiyyətlər əldə etmişdi, lakin Osmanlı üçün uzaq ərəb bölgəsində aparılan fəaliyyətin olduqca məşəqqətli olduğunu bildirirdi. Görünən budur ki, bu məşəqqətlər daha sonra onun da ərəb siyasətilə bağlı qənaətlərini formalaşdırmış oldu.

**4.Hatay məsələsi**

Hatay problemi 1936-cı ildə Fransanın Suriyaya müstəqillik verməsi ilə ortaya çıxdı və 1939-cu ildə Türkiyənin ilhaqı ilə nəticələndi. Bu məsələ indiki dövrdə də Suriya ilə Türkiyə arasında zaman-zaman müzakirələrə səbəb olan problem olaraq qalmaqdadır [Yeni Şafak, Aralık 2021. "Suriye Parlamentosu'ndan bildiri"].

Mudros atəşkəsindən sonra "İsgəndərun Sancağı" (Ərəb tər: Liva-İskəndərun) Suriyadan Anadoluya doğru irəliləyən fransızlar tərəfindən işğal edildi. Beləliklə, bir çox yerlərdə olduğu kimi Hatayda da milli mübarizə cəbhəsi yarandı. 20 oktyabr 1921-ci ildə Fransa ilə imzalanan Ankara müqaviləsinin 7-ci maddəsinə görə, bölgə Suriya sərhədləri daxilində qalacaq; Burada xüsusi bir idarə qurulacaq və türk mədəniyyətinin inkişafı üçün hər cür imkanlardan istifadə olunacaq, rəsmi dil türk dili, pul vahidi olaraq türk lirəsi keçərli olacaq. Daha sonra Lozanna müqaviləsində Suriya ilə Türkiyə arasında çəkilən sərhədə görə Hatay Türkiyə sərhədləri xaricində qaldı.

1936-cı ildə Suriyaya müstəqillik verən və Suriya ilə Fransa arasında ittifaq quran müqavilədə İskəndərun Sancağı ilə bağlı heç bir müddəa yox idi. Fransa Suriyadan çəkilərkən bölgə üzərindəki səlahiyyətlərini Suriyaya buraxırdı. Türkiyə hökuməti vəziyyəti qəbul etmədi. Cenevrədə Millətlər İttifaqının iclasında Fransa ilə aparılan danışıqlar nəticə vermədikdə, 9

oktyabr 1936-cı ildə Fransaya rəsmi nota verildi və Suriyada olduğu kimi İskəndərun Sancağına da müstəqillik verilməsini tələb edildi.

27 yanvar 1937-ci ildə Cenevrədə toplanan Millətlər İttifaqı Hatayın müstəqilliyini qəbul etdi və seçki ilə əhalinin əksəriyyətinin müəyyən edilməsinə qərar verdi. Atatürkün Hatayı silah gücünə ala biləcəyini düşünən fransızlar hərbi müqavilə bağlamaq istəyirdilər və yekunda da bu sövdələşmə həyata keçirildi. Razılaşma ilə Hatayda bitərəf seçki qəbul edildi və bu məqsədlə bəzi hərbi qüvvələrin Hataya daxil olmasına qərar verildi. 1938-ci il sentyabrın 2-də müstəqil Hatay Respublikası quruldu. Bu Cümhuriyyət isə 29 iyun 1939-cu ildə Türkiyəyə birləşməyə qərar verdi [Bekir Tunay, 1986, Atatürk’ün Arap politikası].

Bu hadisələrdən sonra ərəb mətbuatı Türkiyə, Fransa, İngiltərə və onların baş nazirlərinə ağır dillə hücuma keçdi. Suriya mediası İngiltərə və Fransanı Hatay məsələsində Türkiyə ilə əməkdaşlıq etməkdə və problemin həllində suriyalı və ərəblərin istəklərini nəzərə almamaqda günahlandırdı. Dəməşqdə nəşr olunan “Fətəl-Ərab” qəzeti imzalanan müqaviləni Türkiyənin ərəb dünyasına təcavüzünün nəticəsi, Suriya ərazisinin müqəddəs bir hissəsinin ayrılması kimi qiymətləndirdi. Mənbə, Fransanın Hatayın Suriyadan ayrılmasına icazə verməsinin səbəbini Fransanın Türkiyədən daha çox maraqlarının olması ilə əlaqələndirirdi. Qəzet, Suriya hökumətinə bu vəziyyətin qarşısını almaq üçün təcili tədbirlər görməyi tövsiyə edirdi [“İndependent.arabia” saytı, “Liva-İskəndərun; Türkiyə və Suriyanın 80 illik problemi”].

Suriya parlamentinin sədri Fransa hökuməti və Millətlər Liqası Şurasına teleqram göndərərək Hatayın Türkiyəyə qoşulmasına etiraz edirdi. O, Hatayın öz ərazisinin bir parçası olduğunu, qəbul edilən qərarları və üzvlük prosedurlarını qəbul etməyəcəyini açıqlayırdı.

Türkiyə ilə ərəb qonşusu arasında problemlər təkcə Hatay məsələsindən ibarət deyildi. Hatay məsələsindən sonra Türkiyə-Suriya münasibətləri - 90-cı illərin sonuna qədər - sərhədlər məsələsində, su, separatçı kürdlər, İraqın gələcəyi, ABŞ, İsrail və digər ölkələrlə münasibətlərdə olan gərginliklərdə və fikir ayrılıqlarında özünü göstərirdi.

Səksəninci illərdə Türkiyə və Suriya arasında münasibətlərin gərginləşməsinin əsas amili 1984-cü ildə separatçı “Kürdüstan Fəhlə Partiyası”nın (PKK) lideri Abdullah Öcalana Dəməşqdə sığınacaq verilməsi, onun rəhbərlik etdiyi terror təşkilatının üzvlərinə Suriya ərazisində yerləşməsi və düşərgələrdə təlimlərin keçirilməsinə imkanların yaradılması idi.

1996-cı ilin əvvəlində Türkiyə prezidenti Süleyman Dəmirəl və baş nazir Məsud Yılmazın dövründə Suriya prezidenti Hafiz Əsədə xəbərdarlıqlar

göndərildi. Türkiyə tələb edirdi ki, PKK-ya birbaşa dəstək dayandırmalıdır, əks halda Türkiyə milli təhlükəsizliyini qorumaq üçün lazım olan addımı atmalı olacaq.

1998-ci ilin oktyabrında Ankara öz qüvvələrini Suriya sərhəddində səfərbər etdikdən sonra Türkiyə ilə Suriya arasında siyasi böhran kəskinləşdi. Gərginliyi dayandırmaq və iki ölkə arasındakı böhranın həllini tələb edən siyasi həllə nail olmaq üçün Ərəb Dövlətləri Liqası, Misir və İran müdaxilə etdilər. Bu kimi regional vasitəçiliklərdən sonra 20 oktyabr 1998-ci ildə Türkiyənin Adana şəhərində iki ölkə arasında "Adana müqaviləsi" imzalandı və beləcə Dəməşqlə Ankara gərginlik mərhələsini müvəqqəti də olsa adlaya bildirlər.

Burada maraqlı məqamlardan biri də Öcalanın Suriyadan çıxandan sonra Liviyadan sığınacaq alması və Türkiyə ilə daha bir ərəb dövləti arasında yeni gərginlik dövrünün başlaması idi.

Türkiyə ilə Suriyanın eləcə də Türkiyə ilə İraqın münasibətlərinə kölgə salan məsələlərdən biri də Anadolunun cənub və cənub-şərqində su bəndlərinin tikilməsi, nəticədə Suriya və İraqı su ilə təmin edən əsas çayların, yəni Dəclə, Fərat və Xaburun su səviyyəsinin kəsin aşağı düşməsi idi.

**5.Türkiyə Ərəb-İsrail qarşıdurmasında**

Suriya ilə Türkiyə münasibətlərində gərginlik Ankara ilə Təl-Əviv arasında hərbi əməkdaşlıqların sürətlənməsindən sonra daha da artmağa başladı. Colan Yüksəkliklərinin İsrail tərəfindən işğal edilməsi ilə barışmayan Suriya ötən əsrin səksən və doxsanıncı illərində də İsrailin ara-sıra hava zərbələrinə məruz qalırdı. Suriya rəhbərliyi sözügedən bu hərbi əməkdaşlığı özü üçün təhdid gördüyü halda, digər ərəb dövlətləri də bu məsələdən narahatlığını ifadə edirdilər. Baxmayaraq ki, səksəninci illərdə İsraillə rəsmi əlaqələri olan iki ərəb dövləti var idisə, indiki dövrdə bu rəqəm altıya çatıb. Təbii ki, qarşılıqlı olaraq, Türkiyə də hakim "Ərəb Sosialist BƏƏS Partiyası"nın PKK-a dəstəyini, habelə Yunanıstan və Kiprlə əlaqələrini özünə ciddi təhdid görürdü.

Suriya-Türkiyə münasibətləri 1998-ci ilin Adana müqaviləsindən sonra əhəmiyyətli dərəcədə dəyişdi. Suriya və Türkiyə hökumətləri arasında dialoq və müxtəlif sahələr üzrə əməkdaşlıq müqavilələri sabiq siyasi ixtilafları kölgədə saxlayırdı. Türkiyədə hakim Ədalət və İnkişaf Partiyasının iş başına gəlməsi bu əməkdaşlıqları daha da artırmışdı. Lakin bu əməkdaşlıq 2011-ci ildə Suriyada Ərəb baharı fonunda yaradan daxili qarşıdurma nəticəsində geriləməyə, rəsmi Dəməşqlə Ankara arasında ciddi problemlərin ortaya çıxmasına səbəb oldu. Bu problemlər Türkiyənin İsraillə münasibətlərinə görə deyil, rəsmi Ankaranın Suriya daxilində silahlı müxalifətə dəstəyinə görə idi.

AKP dönəmində İsraillə əlaqələr səksən-doxsanıncı illərdəki kimi deyildi. Bu əlaqələr çox geriləmişdi. Fələstin və digər ərazilərin işğalına görə Rəcəb Tayyib Ərdoğanın 2009-cu ildə Davos forumuunda “one minute” kimi tanınan məşhur müdaxiləsi, Fələstin ərazilərinin işğalı və uşaqların öldürülməsi ilə bağlı məşhur çıxışı yeni Türkiyənin ərəb və İsrail siyasəti ilə bağlı öncəki illərlə müqayisədə fərqli siyasətini ortaya qoyurdu. Bundan savayı Ərdoğanın adəti üzrə regional problem kimi Fələstin məsələsini BMT Baş Assambleyasının çıxışında demək olar hər il təkrarlaması, İsrail baş nazirlərinin çıxışları ilə bağlı kəskin mövqeləri, Qəzzaya qarşı dörd müharibənin hər birində kəskin açıqlamalarla Təl-Əvivə qarşı mövqe sərgiləməsi və sair ondan xəbər verirdi ki, rəsmi Ankara Qərbin Yaxın Şərq siyasəti ilə elə də razı deyil. Yaxın Şərq problemi ilə bağlı Türkiyənin ən sərt mövqeyi 2010-cu ilin mayında mühasirədə olan Qəzzaya yollanmış Mavi Mərmərə gəmisi və ekipajının İsrail qüvvələri tərəfindən hücuma məruz qalması, 10 fəalın şəhid olması və daha 50 nəfərin yaralanması hadisəsinin zamanına təsadüf edir. Bu hadisədən sonra Türkiyə ilə İsrail arasında münasibətlər minimuma endi və 2022-ci ilə qədər ölkələrin diplomatik nümayəndəliklərində səfirlər deyil, müvəqqəti işlər vəkilləri təmsil olunurdular.

Təl-Əviv-Ankara münasibətlərinin gərginləşməsi fonunda fələstinli hərəkatların o cümlədən HƏMAS-ın Türkiyədə aktiv fəaliyyətə başlaması AKP-nin ərəb dünyası ilə bağlı siyasətinin göstəricisi idi. Xüsusilə də Suriyanın daxili müharibəsində HƏMAS-ın müxalifət tərəfində durması Dəməşqdəki ofisinin bağlanması və buranı tərk etməsi ilə nəticələnmiş, və hərəkat regionda özünə yeni yer axtarışına çıxmışdı. Təbii ki, *HƏMAS* üzvlərinin bu dönəmdə ən çox arxalana biləcəyi İxvan əl-Müslimin hərəkatını ərəb dünyasında dəstəkləyən Qətər və Türkiyə ola bilərdi. *HƏMAS* üzvləri Türkiyə-İsrail münasibətlərinin normallaşması və rəsmi əlaqələri ən yüksək səviyyədə bərpa edilməsi zamanı, yəni cari ildə Təl-Əvivin təzyiqi ilə Türkiyəni tədricən tərk etməyə başladılar [Tətəvvur mufaci: Rəyul-Yəum qəzeti (16.02.2022)].

**6.Türkiyə Suriyanın daxili müharibəsində**

Ədalət və İnkişaf Partiyasının Türkiyə seçkilərindəki qələbəsindən sonra Suriya ilə imzalanmış razılaşmaların icrası sürətləndi və bundan savayı rəsmi Dəməşqlə fərqli sahələr üzrə çoxsaylı yeni müqavilələr də imzalandı. Türkiyə Suriya enerjisinin Avropaya ixracı üçün tranzit yolu kimi rol ala bilər, kimi fikirlərlə yanaşı, Suriya da Türkiyə istehsalı mallarının ərəb dünyasına nəql üçün mühüm qapıdır, fikri iki ölkə iqtisadiyyatının bir-birinə bağlılığını göstərirdi. Buna görə də 2004-cü ildə tərəflər arasında azad ticarət sazişi imzalandı və onun həyata keçirilməsinə 2007-ci ildə başlanıldı. Eyni

kontekstdə iki ölkə arasında sərhədlərin giriş vizası olmadan açılmasına dair razılaşma da əldə edildi.

2011-ci ildə Ərəb baharı fonunda Suriyada da etirazlar tədricən iğtişaşlar və qarşıdurmalara çevrildi. Suriya Ordusundan hərbçilərin ayrılması, Qətər və Səudiyyə Ərəbistanı kimi varlı ərəb dövlətlərinin Suriyada dəyişikliyin həyata keçirilməsi ilə bağlı meyilləri, Qərbin bu məsələdə günü-gündən artan marağı və sair amillər dünya miqyasında cihadçıların bu ölkəyə axışmasına zəmin yaradırdı. Suriyadakı qarşıdurmalarda müxalifət cərgəsinin aparıcı qüvvəsi islamçılar idi. Onların ən aktivi də İxvan əl-Muslimin hərəkatı idi ki, illər idi Qətər, Türkiyə və Məhəmməd Mursinin rəhbərlik etdiyi Misir hökuməti tərəfindən dəstəklənirdi. Qarşıdurmaların elə ilk iki ilində Türkiyə öz seçimini etmişdi. Suriya müxalifətinin aparıcı qüvvəsinin İxvan əl-Müslimin olması, Qərbin müxalifətin dəstəklənməsi ilə bağlı Türkiyəni təşviq və bəzən də ona təzyiq göstərməsi, daha sonra Türkiyə ərazisindən silahların keçirilməsi və müxalifətin silahlandırılması tendensiyasını daha da sürətləndirirdi. Qarşıdurmaların elə ilk ilində rəsmi Dəməşqlə Anakaranın ittihamları qarşılıqlı şəkildə səsləndirilirdi. [Buraq. Əlğəd telekanalının saytı, iyun 2019].

Türkiyə 2012-ci ildən 2016- cı ilə qədər Suriya ərazisinə birbaşa müdaxilədən çəkinir, islamçıların rəhbərlik etdiyi müxalifətin qruplaşmalarını dəstəkləməklə kifayətlənirdi. Lakin Suriyadakı qarşıdurmalar Türkiyənin və ya rəsmi Dəməşqin gözlədiyi kimi getmədiyindən, yəni bir çox ərazilərin İŞİD terror təşkilatının, daha sonra isə Qərbin dəstəklədiyi kürd separatçı bölmələrinin nəzarətinə keçdiyindən dolayı rəsmi Ankara və Dəməşq yeni təhlükələrlə üzləşdiklərini gördülər. Türkiyə 2016-cı ildə YPG, PYD və sair separatçı kürd birləşmələrinə qarşı hərəkətə keçdi və bu yolda Suriya silahlı müxalifətinin bir qism qruplaşmalarını da səfərbər etdi. "Fərat Qaxanı" əməliyyatı görünür Türkiyənin tələblərinə cavab vermədikdən, 2018-ci ildən yenidən "Zeytun Budağı" əməliyyatı həyata keçirildi. Türkiyə bu əməliyyatlarla Suriyanın şimal sərhədi boyu istədiyi kimi bufer zonası yarada bilməyib, ona görə hazırki dövrdə də rəsmi Ankara tərəfindən yeni əməliyyatlarla bağlı xəbərdarlıqlar təkrarlanmaqdadır.

Əslində Türkiyənin Suriyanın şimalında birbaşa əməliyyatlara başlaması təkcə separatçı kürd amili ilə bağlı deyildi. 2016-cı ildə artıq Suriyanın şimalında yerləşən ölkənin ən böyük şəhəri Hələb hökumət qüvvələrinin və İrana bağlı olan Hizbullah hərəkatı və s. qüvvələrin mühasirəsinə düşmüş, bu qüvvələr Rusiya aviasiyasının dəstəyi ilə Türkiyə sərhədlərindəki bölgələri yenidən ələ keçirmək üzrə idilər. Belə bir anda Türkiyə hərəkətə keçməli, dəstəklədiyi müxalifətin silahlı qruplarının məğlub olmasına icazə verməməli idi. Buna görə Türkiyə Suriya hökumətini mülki insanlara qarşı qətliam

törətmək, rəsmi Dəməşq isə Türkiyəni radikal islamçı və cihadçı qruplaşmaları dəstəkləməkdə ittihamlandırırdı. Qarşıdurma sonda Türkiyə, Rusiya və İranın Suriyanın şimalı ilə bağlı razılaşması ilə dayandı və 2017-ci ildə üç ölkə arasında İdlib əyaləti və ətrafı ilə bağlı əldə edilən "Deskalasiya zonası atəşkəs anlaşması" hələ də qüvvəsində qalmaqdadır. Məhz bu üç region gücünün təşəbbüsü ilə "Astana danışıqları formatı" çərçivəsində Suriya hökuməti ilə müxalifət ara-sıra toplanır və gələcək "Suriya konstitusiyasının" yazılması və münaqişənin nizamlanması istiqamətində digər vacib məsələləri müzakirə edirlər.

2021-ci ilin oktyabrında Türkiyənin xarici işlər naziri Mövlud Çavuşoğlu Qoşulmama Hərəkatının Zirvə toplantısında Suriyanın xarici işlər naziri Feysal Miqdad ilə görüşüb və iki ölkənin kəşfiyyat qurumları arasında təmaslar və danışıqlar bərpa olunub. Çavuşoğlu bunu 2022-ci ilin avqustunda açıq elan edib və Suriya hökuməti ilə müxalifəti barışığa çağırıb. Türkiyənin rəsmi mediası Suriya hökumətinin diplomatik əlaqələrin bərpası üçün qarşıya qoyduğu 5 şərti belə dərc edib:

İdlib üzərində hökumət nəzarətinin bərpası, Bab əl-Həva sərhəd-keçid məntəqəsi və Kəsəb gömrük keçidinin idarəsini Suriya hakimiyyətinə təhvil vermək, Suriyanın şimalında Qərb və Şərq əyalətlərini birləşdirən Hələb, Latakiya, Dirazzur və Həsəkə arasındakı xəttdə yerləşən M4 kimi tanınan strateji nəqliyyat dəhlizinə tam nəzarətin bərpası və Türkiyənin ABŞ və Avropa sanksiyalarına dəstək verməməsi.

Bunun müqabilində Ankara Dəməşqin PYD, YPG və PKK-nın olduğu ərazilərini tamamilə təmizləməsini, qaçqınların təhlükəsiz geri qayıtmasını və müxalifətlə hökumət arasında siyasi və hərbi inteqrasiyanın lazımi qaydada tamamlanmasını istəyir.

**7.Türkiyə və İxvan əl-Muslimin hərəkatı**

Türkiyə-Suriya, Türkiyə-İraq münasibətlərinin əsas müzakirə obyekti ərazi iddiaları və separatçı kürd birləşmələrinə qarşı mübarizə fəaliyyəti təşkil edirsə, Ankaranın digər ərəb dövlətləri ilə əlaqələrində əsas müzakirə obyekti özəlliklə iqtisadi maraqlar və dini idoloji nüfuzdan ibarətdir. Türkiyənin Qətər və Liviyaya hərbi qüvvələr ezam etməsi, Sudan kimi ölkələrdə bu hərbi mövcudluğun olmasına can atması və ya Somalidə buna oxşar addımların atılması həm də keçmiş Osmanlı İmperiyasının istəklərinin yenidən gündəmə gəlməsindən xəbər verir [Əl-Cəzirə telekanalı, 07.07.2017].

"Ərəb baharı" fonunda bölgədə totalitar rejimlərin islamçı cərəyanların daha aktiv olduğu müxalifətlə sıxışdırılmasından sonra bölgədə əsas iki siyasi və iqtisadi güc olan Ərəb Dövlətləri Liqası və Körfəz Əməkdaşlıq Şurası prosesə qarşı çıxdılar. Ərəb Dövlətləri Liqası və Körfəz Əməkdaşlıq Şurası Misir, Yəmən, Tunisdə islamçıların çoxluq təşkil etdiyi müxalifət cərəyanına

qarşı mövqelər sərgiləyirdisə, Suriya və Liviyada bu cərəyanı birbaşa və ya dolayısı yolla dəstəkləyirdilər. Misirdə İxvan əl-Muslimin hərəkatının ayaq açmasından narahat olan bu iki siyasi təşkilat, Suriyada tam əksinə onun silahlanması üçün hərəkətə keçdilər [Report. Usatoday.com, 21.01.2013]. Lakin Türkiyə bütün ərəb dövlətlərində baş qaldırmaqda olan İxvan əl-Muslimin cərəyanına dəstəyə başladı. Bu işdə Ərəb dünyasında Qətər öndə gedir, Doha ilə Ankaranın İxvan əl-Müsliminə bu dəstəyi bölgədə yeni regional koalisiya formalaşdırmışdı.

Əslində Ərəb dünyasında islamçı hərəkatlar içində ən böyük sosial bazası olan İxvan əl-Müslimin təkcə Türkiyənin deyil, İranın da maraq dairəsində olub və görünür bundan sonra da olacaq. Faktiki olaraq İran İslam Respublikası şiə amili olan İraq, Suriya, Yəmən və Livan istisna olmaqla digər ərəb dövlətlərində xüsusilə də Fələstində bu islamçı hərəkatı dəstəkləməkdədir. Təbii ki, AKP hakimiyyətə gələndən sonra Türkiyə bu amili yaxşı görür, meydanı digər ölkələr üçün boş saxlamaq niyyətində olmayıb.

İxvan əl-Muslimin hərəkatının Fələstin qanadı yəni HƏMAS-ın İran və Türkiyə ilə sıx siyasi və hərbi əlaqələri, digər tərəfdən Ərəb Dövlətləri Liqası və Körfəz Əməkdaşlıq Şurasının HƏMAS-la düşmənçiliyi əbəs deyil. Adıçəkilən iki güçlü təşkilat ərəb dünyasında hər hansı bir cərəyanın Türkiyə və İranın nüfuz dairəsinə düşməsindən həmişə ehtiyatlanır, mütəmadi olaraq "ipə sapa yatamayan" bu kimi hərəkatlara maddi və siyasi dəstəklər vəd edirlər.

Lakin fələstinli hərəkatlara və digər İxvançı cərəyanlara maddi dəstək vəd edən Qətər, habelə İranın və Türkiyənin bu cərəyanlara dəstəyinə dəstək verən rəsmi Doha az keçməmiş körfəzdə yerləşən digər ərəb dövlətlərinin qəzəbinə tuş gəldi. Məhz buna görə varlı ərəb dövlətləri və Misirdən ibarət siyasi koalisiya 2017-ci ildə Qətərlə siyasi və iqtisadi əlaqələri kəsdilər və bu əmirliyi blokadaya saldılar. Blokadanın ik günlərində Türkiyənin Dohaya hərbi qüvvələrini ezam etməsi, İranın dənizdən Türkiyənin və özünün ərzaq yardımlarını Dohaya çatdırması sanksiya tətbiq edən digər ərəb dövlətlərini daha da qəzəbləndirdi. Qətiyyətlə demək olar ki, Türkiyə hərbi qüvvələrinin zamanında Dohaya yerləşdirilməsi, habelə ABŞ və Britaniyanın bu işə razı olmaması Qətər hakimiyyətinin digər qonşu ərəb dövlətləri tərəfindən devrilməsinin qarşısını aldı.

Türkiyənin Qətərlə əlaqələri təkcə İxvan əl-Muslimin cərəyanı ilə bağlı deyil. İki ölkə XXI əsrin əvvəllərindən münasibətlərini möhkəmləndirməyə başlayıblar. Tərəflər arasında Birgə Ali Strateji Komitə 2014-cü ilin dekabrında yaradılıb və onun iclasları hər il ən yüksək səviyyədə keçirilir. Bu müştərək komitənin işi iki ölkə arasında iqtisadi əlaqələri

möhkəmləndirməkdir. Qətərin əmiri Təmim bin Həmd Ali-Saninin Türkiyəyə 2022-ci ilin oktyabrında səfəri zamanı tərəflər arasında 11 müqavilə imzalanıb [TRT telekanalı, (13.10.2022). www.trtarabi.com].

Türkiyənin Liviyadakı maraqları təkcə İxvan əl-Müslimin cərəyanına həsr edilmir. Ərəb baharı fonunda Liviyada Müəmmər Qəddafinin devrilməsindən sonra baş verən siyasi proses və qarşıdurmalarda Türkiyə əsas beynəlxalq tərəflərdən birini təşkil edib. Əsasən Tripoli və ətraf əyalətləri nəzarətdə saxlayan, sabiq islamçı üsyançıların çoxluq təşkil etdiyi “Milli Birlik Hökuməti” Türkiyə tərəfindən dəstəklənməkdədir. Türkiyə Liviyada legitimliyi dəstəkləmək istəyini açıqlamaqla iki paralel hökumətdən birinə hərbi, siyasi dəstəyini davam etdirir. 2016-cı ildə bu dəstək Türkiyə və Suriyadan hərbi qüvvələrin Tripoliyə ezamı ilə təzahür edirdi. Son illərdə Türkiyənin Tripolidəki hökumətlə Aralıq dənizində neft-qaz yataqlarının kəşfiyyatı və işlənilməsi ilə bağlı müqavilələri mərkəzi Tobruqda olan Parlament və hökumətin ciddi narazılığına və bəzi məqamlarda qarşıdurmalara da səbəb olub.

Səudiyyə Ərəbistanı vətəndaşı, məşhur jurnalist Camal Kaşıkçının 2018-ci ilin oktyabr ayında krallığın İstanbuldakı konsulluğunda amansızca qətlə yetirilməsi Türkiyənin ərəb dünyasında insan hüquqları ilə bağlı iddialarının artmasına səbəb oldu. Bu mərhələ, ən nüfuzlu ərəb dövləti Səudiyyə Ərəbistanında və onun siyasi koalisiyasında yer alan ölkələrdə rəsmi Ankara ilə münasibətlərin daha da gərginləşməsinə səbəb oldu. ABŞ-da demokratların Səudiyyə Ərəbistanına qarşı kompaniyasına qoşulan Türkiyə hökumətinin addımları Körfəz Əməkdaşlıq Şurası üzvləri tərəfindən birmənalı qarşılanmadı. Bundan savayı Türkiyədəki demokratik dəyişikliklər sistemi, habelə neft və qaz kimi maddi resursları olmayan Türkiyənin sənayesi iqtisadi mövzularda da ərəb totalitar ölkələrində qısqanclıqla qarşılanırdı. Belə bir müqayisə fonunda Türkiyənin sünni ərəb dünyasındakı dini nüfuzu bəzi körfəz Ərəb dövlətlərini narahat etməyə bilməz. Baxmayaraq ki, son ildə Türkiyə BƏƏ və Səudiyyə Ərəbistanı ilə münasibətlərin öz məcrasına qayıtması istiqamətində mühüm addımlar atıb və hətta əməkdaşlıq sahəsində yeni razılaşmalar da əldə edilib.

**8.Nəticə**

Türkiyənin ərəb dünyası ilə bağlı maraqları son yüz ildə üç dəfə ciddi dəyişikliyə məruz qalıb. Anadolu coğrafiyasında siyasi hakimiyyətin dəyişməsi maraqların müəyyən mənada dəyişməsinə, bəzən də ərəb coğrafiyası və dövlətləri məsələsinin prioritetlər sırasından çıxmasına və ya yenidən həmin cərgəyə geri gətirilməsinə səbəb olub. Osmanlı İmperiyası dönəmində müsəlman coğrafiyasının vəziyyəti prioritet olaraq gündəmdə

saxlanılsa da, cümhuriyyət dönəmində gündəmdən çıxarılmış, lakin XXI əsrdə yenidən Türkiyənin xarici siyasətinin ayrılmaz hissəsinə çevrilmişdir.

## ƏDƏBİYYAT

**1.** Əl-Sirac, M. (2018). *Əlaqatul-ərəb vəl-Usmaniyyin bəynəl-İslami vəl-Qəumiyyə*, 12.03.2018. Retrieved from https://www.turkpress.co/node/46970

**2.** (2009). *Əl-Dəriyyə əla lisanit-tarix*, Əl-Riyad qəzeti. 10.07.2009. https://www.alriyadh.com/443574

**3.** Əl-Səllabi, Ə. (2021). *Cuhud Sultan Əbdülhəmid fi ət-Təsəddi lil-hərəkə əl-Səhyuniyyə*, Al-Jazeera, 23.05.2021. Retrieved from https://www.aljazeera.net/blogs/

**4.** *Atatürk Research Centre Journal, November 2010, Number 78,* Arap Yarımadasında İsyan.

**5.** (1972). T.C.Genelkurmay, *Türk İstiklâl Harbine Katılan Tümen ve Daha Üst Kademelerdeki Komutanların Biyografileri*, Ankara. Harp Tarihi Başkanlığı Yayınları, s.1-17.

**6.** (1993). Eskişehir İzmir Konuşmaları. Kaynak Yay, İst., sf.95, *Mosul problemi*.

**7.** Olcay, O. (1981). *Sevr Anlaşmasına Doğru*. Ankara, SBF Yay, s.121.

**8.** Mumcu, U. (1995). "*Kürt-İslam Ayaklanması*", SBF Yay, 19.Bas. 1995, s.28.

**9.** Bozkurt, G. (2003). *Atatürk Dönemi Türk Dış Politikası*, Atatürk Araştırma Merkezi Dergisi, (56. Erişim tarihi: 14 Aralık 2009). Temmuz 2003.

**10.** *Suriye Parlamentosu'ndan bildiri: Hatay'ı geri alacağız. (2021).* Yeni Şafak, 2 Aralık 2021. https://www.yenisafak.com/

**11.** Bekir Tunay, (1986). Atatürk'ün Arap politikası. *Atatürk Araştırma Merkezi Dergisi*, *Sayı 5, Cilt: II*, Mart 1986.

**12.** Rustam, M. (2021). *Bədə 8 uqud... Liva İskəndərun yuşil əzmət bəynə Turkiya və Suriya*, 06.12.2021. Retrieved from https://www.independentarabia.com

**13.** (2022). *Tətəvvur mufaci: Turkiya təsa li-tərd qadət Həmas*. Rəyul-Yəum qəzeti (16.02.2022). www.raialyoum.com

**14.** Buraq T. (2019). *Əl-cəmaat əl-musəlləhə əl-muvaliyə li-Turkiya*. Əlğəd telekanalının saytı, iyun 2019, alghad.com

**15.** (2017). *Qərar İrsal Quvvat Turkiyyə ilə Qatar*, Əl-Cəzirə telekanalı, 07.07.2017. https://www.aljazeera.net/

**16.** (2013), *Report: Saudis sent death-row inmates to fight Syria*. Usatoday.com, 21.01.2013. https://www.usatoday.com
**17.** (2022), *Əmir Qatar yasil İstanbul lil-muşarakati fi ictima əl-Lucnəl-istiraticiyyət-Türkiyyə*. TRT telekanalı, (13.10.2022). www.trtarabi.com.

## Арабский фактор в обосновании Турецкой Республики и современный период

**Фарда Асадов***
**Самид Багиров****

**Абстракт.** Интересы Турции связанные с арабским миром на протяжении последних ста лет трижды подвергались серьезным изменениям. Смена политической власти в анатолийской географии привела к определенным изменениям интересов, а также переходу арабской географии и проблем государств из зоны приоритетов и последующему возвращению к исходным позициям. Несмотря на то, что в период Османской империи положение мусульманской географии сохраняло свою привилегированность, во времена республики оно лишилось этого права и только в начале XXI века вновь стало неотъемлемой частью внешней политики Турции.

**Ключевые слова**: Турецкая Республика, арабский мир, проблема Хатая, соглашение Сайкса-Пико, Мустафа Кемаль Ататюрк, Партия Справедливости и Развития.

---

* Доктор философских наук по истории,
Старший научный сотрудник и заведующий отделом “Истории и экономики арабских стран” Института Востоковедения имени академика Зии Буниятова НАНА; Баку Азербайджан
E-mail: asadovfm@hotmail.com
https://orcid.org/0000-0002-9034-0011
** Научный сотрудник Института Востоковедения имени академика Зии Буниятова НАНА; Баку, Азербайджан (ответственный автор)
E-mail: sami80@mail.ru
**Цитировать статью:** Асадов, Ф., & Багиров, С. [2023]. Арабский фактор в обосновании Турецкой Республики и современный период. *Журнал «Metafizika», 6(3),* с.10-29.

**История статьи:**
*Статья поступила в редакцию: 13.05.2023*
*Отправлена на доработку: 16.06.2023*
*Принята для печати: 01.09.2023*

## The Arab Factor in the Establishment of the Republic of Turkey and the Contemporary Period

**Farda Asadov**[*]
**Samid Baghirov**[**]

**Abstract.** Turkey's interests in the Arab world have significantly changed, three times, over the last century. Changes in political power in the geography of Anatolia involved a shift in political interests in some sense; sometimes the issue of Arab geography and states was dropped from the list of priorities but then brought back to that list again. Although at the time of the Ottoman Empire, the state of the Muslim world was considered a priority, during the republic it was removed from the agenda. However, in the 21st century, it has again become an integral part of Turkey's foreign policy.

**Keywords:** Republic of Turkey, Arab world, Hatay problem, Sykes-Picot Agreement, Mustafa Kemal Atatürk, Justice and Development Party

## REFERENCES

1. Al-Siraj, M. (2018). *Alaqatul-arab wal-Usmaniyyin baynal-Islami wal-Qaumiyya*, 12.03.2018. Retrieved from (in Arabic) https://www.turkpress.co/node/46970
2. (2009). *Al-Dariyya excellent lisanit-history*, Al-Riyadh newspaper. 10.07.2009. (in Arabic) https://www.alriyadh.com/443574
3. Al-Sallabi, A. (2021). *Juhud Sultan Abdulhamid fi al-Tasaddi lil-haraka al-Sahyuniya*, Al-Jazeera, 23.05.2021. Retrieved from (in Arabic) https://www.aljazeera.net/blogs/
4. *Ataturk Research Center Journal, November 2010, Number 78,* Rebellion in the Arabian Peninsula. (in Turkish)
5. (1972). T.C. Genelkurmay, *Biographies of Commanders in Divisions and Higher Echelons Participating in the War of Turkish Independence,*

[*] Doctor of Philosophy in History,
Senior researcher and head of department of the Institute of Oriental Studies named after Academician Ziya Bunyadov of ANAS; Baku, Azerbaijan
E-mail: asadovfm@hotmail.com
https://orcid.org/0000-0002-9034-0011
[**] Scientific worker of the Institute of Oriental Studies named after academician Ziya Bunyadov of ANAS; Baku, Azerbaijan (corresponding author)
E-mail: sami80@mail.ru

**To cite this article:** Asadov, F., & Baghirov, S. [2023]. The Arab Factor in the Establishment of the Republic of Turkey and the Contemporary Period. *"Metafizika" journal, 6(3),* pp.10-29.

**Article history:**
*Received: 13.05.2023*
*Accepted: 01.09.2023*

*Ankara*. Publications of the Department of Military History, pp. 1-17. (in Turkish)

**6.** (1993). *Eskişehir Izmir Speeches.* Kaynak Yay, Ref., p.95, Mosul problem. (in Turkish)

**7.** Olcay, O. (1981). *Towards the Treaty of Sèvres.* Ankara, SBF Yay, p. 121. (in Turkish)

**8.** Mumcu, U. (1995). *Kurdish-Islamic Uprising*, SBF Summer, 19. Bas., p. 28. (in Turkish)

**9.** Bozkurt, G. (2003). Atatürk Era Turkish Foreign Policy. *Atatürk Research Center Journal*, (56. Access date: 14 December 2009). July 2003. (in Turkish)

**10.** *Statement from the Syrian Parliament: We will take back Hatay.* (2021). Yeni Şafak, December 2, 2021. (in Turkish) https://www.yenisafak.com/

**11.** Bekir Tunay, (1986). Arab policy of Atatürk. *Atatürk Research Center Journal, 2(5)*, March 1986. (in Turkish)

**12.** Rustam, M. (2021). *Bada 8 ugud... Liva Iskander's yushil ezmat beyna Turkey and Syria,* 06.12.2021. (in Arabic) Retrieved from https://www.independentarabia.com

**13.** (2022). *Tatavvur Mufaji: Turkey’s unification of Hamas.* Rayul-Yaum newspaper (16.02.2022). (in Arabic) www.raialyoum.com

**14.** Burag T. (2019). *Al-jamaat al-musallah al-muwaliya li-Turkey.* Alghad TV channel website, June 2019, (in Arabic) https://alghad.com/

**15.** (2017). *Qarar Irsal Quwwat Turkey and Qatar.* Al-Jazeera TV channel, 07.07.2017. (in Arabic) https://www.aljazeera.net/

**16.** (2013). *Report: Saudis sent death-row inmates to fight Syria.* Usatoday.com, 21.01.2013. (in English) https://www.usatoday.com

**17.** (2022). *Amir Qatar yasil Istanbul lil-musharakati fi ijtima al-Lucnal-istiratiqiyyat-Turkey.* TRT TV channel, (13.10.2022). (in Arabic) www.trtarabi.com.